Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

(*English*)

## THE WAYS OF ENHANCING PROFESSIONAL COMPETENCES OF TEACHERS

**A.Abdullayev**

**Abstract**. The quality of education and its effectiveness depends on the level of qualification and professional competences of pedagogical personnel. In the article the ways of enhancing professional competences and professional skills of pedagogical personnel, new methods and competent approach to them is expressed.

---

**Keywords.** Professional competence, competent approach, pedagogical skill, professional teacher.

(*Azerbaijan*)

## MÜƏLLİMİN PEŞƏ BACARIĞININ YÜKSƏLDİLMƏSİ FAKTORLARI VƏ YOLLARI

**Atəş Abdullayev**

*Pedaqogika üzrə fəlsəfə doktoru, Azərbaycan Müəllimlər İnstitutunun dosenti*

**Açar sözlər.** Peşə bacarığı, kompetent yanaşma, pedaqoji ustalıq, peşəkar müəllim.

(*Russian*)

## ПУТИ И ФАКТОРЫ РАЗВИТИЯ ПРОФЕССИОНАЛЬНОЙ КОМПЕТЕНТНОСТИУЧИТЕЛЯ

**А.Абдуллаев**

Эффективность и качество образования зависит от уровня квалифицированных и профессиональных подготовок педагогических кадров. Профессиональное развитие педагогических кадров достигаются разнообразными способами. В статье излагаются факторы повышения профессиональных компетенций учителя, компетентный подход к ним, методы и формы формирования педагогического и профессионального мастерства педагога.

**Ключевые слова.** Профессиональная компетенция, компетентный подход, педагогическое мастерство, профессиональный учитель.

Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

Müasir sosial-iqtisadi şəraitdə yüksək ümumi və peşə bacarığına yiyələnən şəxsiyyətin dəyəri yüksək səviyyəyə qalxmışdır. Hazırda təhsil sisteminin əsas məqsədi təhsilin bütün pillələri və səviyyələrində gənc nəslin təlim və tərbiyəsinin keyfiyyətini yüksəltməkdən ibarətdir. Yalnız o təhsil müəssisəsi rəqabət qabiliyyətli hesab olunur ki, təhsilin yüksək keyfiyyətinə zəmanət verir.

Təhsil sisteminin effektliliyi və təhsilin keyfiyyəti bütövlükdə pedaqoji və rəhbər kadrların ixtisas və peşə bacarığının səviyyəsindən asılıdır. Çünki təhsildə keyfiyyət dəyişiklikləri müəllimlərin peşə bacarığı və qabiliyyətinin səviyyəsi ilə müəyyənləşir. Təhsilin əsas məzmununu təşkil edən bu məsələyə diqqətin artırılması müəllimlərin pedaqoji bacarığının inkişafı faktorları və şərtlərini aktuallaşdırır. “Pedaqoji peşə bacarığı” termini altında nə başa düşülür? Hansı müəllimi peşə bacarığı olan şəxs hesab etmək olar? Peşə bacarığı, bir tərəfdən, peşə təhsili və peşə bacarığının inteqrativ keyfiyyəti kimi başa düşülürsə, digər tərəfdən, ona şəxsiyyətin keyfiyyəti kimi baxılır. Bura yüksək icra keyfiyyəti, əmək mədəniyyəti və şəxsiyyətlərarası ünsiyyət, peşə problemlərini yaradıcı və təşəbbüskarlıqla həll etmək bacarığı, habelə idarəçilik məsələlərini qəbul etməyə hazır olmaq, yeni şəraitdə fəaliyyətə uyğunlaşmaq və s. xüsusiyyətlər xasdır [1, s.113].

Peşəkar müəllim elə mütəxəssisdir ki, peşə normalarını bilir, qarşısına müstəqil məqsəd qoyur, öz təşəbbüsü ilə peşə qabiliyyətini inkişaf etdirir, yüksək motivasiya və özünütənzim səviyyəsinə malik olur, öz fəaliyyətini düzgün idarə etməyi bacarır. Peşə bacarıqlarına ixtisas (fənn) bacarıqlarından daha çox şəxsiyyət keyfiyyətləri daxildir. Buradan belə çıxır ki, peşə bacarığına malik olan müəllim pedaqoji fəaliyyətini, ünsiyyətini tələb olunan səviyyədə həyata keçirir, şagirdlərin təlim və tərbiyəsi işində yüksək nəticələr əldə edir.

Beləliklə, peşə bacarığının inkişafı dedikdə, müəllimin şəxsi yaradıcılığının inkişafı, yeniliyi qəbul etmək sahəsində formalaşması, ixtisasını, fənnini, onun tədrisi metodikasını və uşaq psixologiyasını dərindən bilmək əsasında pedaqoji innovasiyaları dərk etməsi və tətbiq etmək bacarığı başa düşülür. Müəllimin peşə bacarığının yüksəldilməsi təhsilin, təlim və tərbiyənin keyfiyyətini yüksəltməyin əsas şərtlərindən biridir.

Bəzən müəllim kifayət qədər nəzəri peşə biliklərinə malik olmasına baxmayaraq, praktik fəaliyyətində yüksək nəticələr əldə edə bilmir. Bu zaman müvəffəqiyyət əldə etməyə, habelə peşə bacarıqlarını yüksəltməyə imkan verən pedaqoji faktorlara diqqət yetirmək lazım gəlir. Peşə bacarıqlarının inkişafının əsas faktorları müəllimin reflektiv mövqeyidir; onun fasiləsiz təhsil sisteminə bağlılığıdır. Müəllimin reflektiv mövqeyi bütövlükdə təhsil prosesinin keyfiyyətinə təsir edən mühüm faktordur.

Ümumi təhsilin məzmununun modernləşdirilməsi strategiyasında kompetent yanaşma əsas yollardan biridir. Kompetent yanaşmanın mühüm əlaməti özünütəhsil, özünütəlim qabiliyyətinin daha da inkişafıdır, çünki dərin biliklər əldə etmədən kompleks biliklərə yiyələnmək mümkün deyil.

Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

Müəllim elə şərait yaratmalıdır ki, şagird intellektual və yaradıcı qabiliyyətini inkişaf etdirə bilsin və öz biliklərini, bacarıq və təcrübəsini müxtəlif həyati situasiyalarda tətbiq etməyə hazır olsun.

Kompetentlik (latınca kompetensius) – bir çox məsələlər dairəsini əhatə edir: bilik, idrak, təcrübə, habelə müəssisədə səlahiyyətlərini bilmək; kompetentliyə (bacarığa) yiyələnmə alqoritminin ("bilirəm, necə") həllini bilmək. Müəllimin kompetentliyi dedikdə, onun peşə fəaliyyətini uğurla yerinə yetirmək qabiliyyəti, məhsuldar əməyə hazır olması, peşə fəaliyyəti və pedaqoji ustalığını yaradıcı şəkildə əldə etməsi başa düşülür. Kompetentliyə yiyələnmək - bilmək, nə etmək, nə üçün və necə etmək, qeyri-standart şəraitdə qərarlar qəbul etmək və onların icrasına hazır olmaq deməkdir [2, s.32].

Müəllimin kompetentliyi haqqında ümumi şəkildə aşağıdakıları söyləmək olar:

- təhsilin məqsədi və nəticələrini müəyyən etmək qabiliyyəti, bacarığı və hazırlığı;
- şagirdlərin meyilini, fərdi xüsusiyyətləri və maraqlarını nəzərə almaqla onları müxtəlif növ fəaliyyətə cəlb etmək bacarığı;
- uşaqların imkanlarına uyğun tələb olunan kompetensiyaları (bacarıqları) yerinə yetirmələri üçün müxtəlif metod və priyomlardan istifadə etmək bacarığı;
- şagirdlərin meyilini müşahidə etmək, onların inkişafının təxmini istiqamətini müəyyən etmək bacarığı;
- şagirdlərin qrup və layihə fəaliyyətini təşkil etmək bacarığı və s.

İqtisadi çətinliklərlə bağlı müəllimlik peşəsinin nüfuzunun nisbətən aşağı düşdüyü bir şəraitdə məktəbdə fənlərin tədrisi getdikcə mürəkkəbləşir. Çox vaxt fənnə münasibət müəllimə münasibət ətrafında mərkəzləşir. Buna görə də müəllimdən şəxsi keyfiyyətlər tələb olunur. Çünki peşə bilikləri ilə yanaşı, kommunikativ qabiliyyətlər böyük əhəmiyyət kəsb edir. Şagirdlə müəllimin ünsiyyəti yalnız qarşılıqlı fəaliyyət kimi deyil, həm də qarşılıqlı təsir vasitəsi kimi nəzərdən keçirilir. Bu proses o zaman baş verir ki, şagird pedaqoji fəaliyyətin obyekti kimi deyil, subyekti kimi qəbul edilsin.

İxtisasartırma təhsilinə cəlb olunan müəllimlərin kursla bağlı arzu və təkliflərinin təhlili deməyə əsas verir ki, pedaqoqun peşə bacarıqlarının yüksəldilməsində həlledici məsələ onun xüsusi özünüinkişafı, özünütəkmilləşdirməsi və özünütəsdiqi hesab olunur. Müəllimin fasiləsiz özünütəkmilləşdirməsi onun fasiləsiz təhsil hazırlığında şüurlu fəaliyyəti kimi qiymətləndirilir.

Müxtəlif fənn müəllimləri ilə aparılan anket sorğularının nəticələrinin təhlili göstərir ki, müəllimin uğur qazanmasına bir sıra amillər təsir edir:

- ixtisasartırma və təkmilləşdirmə kurslarında alınan biliklər;
- elmi-metodik və elmi-praktik məzmunlu nəşrlərlə tanışlıq;
- özünün pedaqoji işləmələri;

- şagirdlərlə ünsiyyət və iş;
- istedadlı gənclərlə iş, onlarla müxtəlif tədbirlər və s. [3, s.24].

Müəllimin əsas kompetensiyası onun pedaqoji fəaliyyəti dövründə daimi özünütəlimə daxil olmaq bacarığı ilə bağlıdır. Müəllimlər hər il öz təcrübələri ilə bağlı elmi-praktik konfranslarda, "Pedaqoji mühazirələr"də, "Dəyirmi masalar"da, "İlin müəllimi" müsabiqələrində, elmi-metodik şuralarda, dövri mətbuat səhifələrində fikirlərini bölüşürlər.

Hər bir müəllimin əsas vəzifəsi şagirdlərin intellektual və yaradıcılıq qabiliyyətini, onların mənəvi və vətəndaşlıq keyfiyyətlərini inkişaf etdirməkdir.

Təhsil müəssisələrində təlimin keyfiyyətinin təkmilləşdirilməsi müəllimin hazırlığından asılıdır. Təbii ki, başqalarını öyrətmək üçün daim özünü təkmilləşdirmək lazımdır. Müəllim təkcə tədris etdiyi fənni və onun tədrisi metodikasını bilməklə kifayətlənməməli, hərtərəfli inkişaf etmiş şəxsiyyət olmalıdır. Müasir müəllim elə olmalıdır ki, dövrün tələblərinə cavab verməklə yanaşı, öz şagirdlərinin tələblərinə də cavab verə bilsin. Hər bir pedaqoq peşə hazırlığının səviyyəsini müntəzəm olaraq kurs hazırlığı, seminar, praktikumlar, müsabiqələr vasitəsilə artırmalıdır. Pedaqoji fəaliyyət üçün bu şərtlər şüurlu yaradıcı proses olan özünütəhsil prosesi olmadan mümkün olmaz.

Öz bilik və təcrübəsini başqalarına verən müəllimin üzərinə müəyyən öhdəlik düşür:

- fənni üzrə təhsil prosesinin keyfiyyətini yüksəltmək;
- metodik vəsaitlər, məqalə, dərslik və proqramlar hazırlamaq və nəşr etdirmək;
- təlimin yeni forma, metod və vasitələrini tətbiq etmək;
- məruzə, çıxış hazırlamaq, açıq dərslər təşkil etmək;
- didaktik materiallar, testlər, əyani və təlimin texniki vasitələrini işləyib hazırlamaq;
- treninq, seminar, konfrans keçirmək;
- tədqiq olunan problem üzrə təcrübəni ümumiləşdirmək və s.

Xüsusi, qeyri-adi peşə sahibi olan PEDAQOQ – bir tərəfdən dərin bilik, geniş erudisiya, fəlsəfi, məntiqi düşüncəyə malik, həyatı bilən, digər tərəfdən xeyirxah, insanpərvər, başa düşməyi və bağışlamağı bacaran, yüksək hissiyyatlı, tələbkar, başqa sözlə, tədris etdiyi fənni və şagirdlərini sevən şəxs olmalıdır. V.A.Suxomlinskinin təbirincə desək, "Yaxşı müəllim – bu, hər şeydən əvvəl, uşaqları sevən insandır, sevincini onlarla ünsiyyətdə tapır, inanır ki, hər bir uşaq yaxşı insan ola bilər, uşaqlarla dostluq etməyi bacarır, uşaq sevincini və kədərini ürəyinə yaxın qəbul edir, uşağın qəlbini duyur, heç zaman unutmur ki, o, özü də uşaq olmuşdur [4, s.36].

Pedaqoq peşələrin içərisində ən xeyirxahıdır, axı müəllim - tərbiyəçi şəxsiyyətin mənəvi aləminin, gələcək cəmiyyətin yaradıcısıdır. O, XXI əsrdə yaşayacaq nəslin tərbiyəsi və inkişafının cavabdehidir. Onun pedaqoji fəaliyyətində şəxsi keyfiyyəti və

peşəkarlığından yalnız bir uşağın gələcəyi asılı deyil. Pedaqoji ustalığın zirvəsinə qalxmaq bu gün olduqca vacibdir. Çünki müalicə kimi, tərbiyə etmək də, öyrətmək də yüksək keyfiyyətli və peşəkar mütəxəssislərin olmasını tələb edir.

Pedaqoji peşə - insanşünaslıqdır, daim insanın mürəkkəb aləminə nüfuz etməkdir, onun inkişafını kəşf etməkdir. Müəllim əməyinin obyekti uşaq şəxsiyyətinin mənəvi həyatıdır, ağıl, hiss, iradə, inam, şüurdur, onun son nəticəsi bu gün deyil, sabah deyil, tərbiyə olunanın bütün həyatında özünü göstərəcək.

Müasir müəllimi biz necə görürük? Bu, ümuminsani və milli, habelə xüsusi humanist təcrübəsi olan, bu və ya digər pedaqoji məsələlərin həllində müstəqil qərar qəbul edib, həyata keçirən, uşaqların inkişafı, tərbiyəsi və təlimi üçün şərait yaradan şəxsiyyətdir. Buna görə də günümüzün tendensiyalarını nəzərə alaraq, pedaqoji fəaliyyətin ənənəvi funksiyalarını yeni tərzdə düşünüb təhsilin inkişafında mütərəqqi ideyaları həyata keçirmək lazımdır.

Bu spesifik cəhətləri nəzərə alaraq pedaqoji kadrların hazırlanması, onların özünütəhsili, əməyinin nəticələrinin düzgün qiymətləndirilməsi problemi aktuallıq kəsb edir. Qeyd edək ki, pedaqoji peşəkarlığın yüksək səviyyəsi olan peşə fəaliyyətinin özünütəşkili uşaq şəxsiyyətinin özünüinkişafına zəmanətdir ki, bu da onun pedaqoji ustalığı ilə təmin olunur. Pedaqoji ustalıq – şəxsiyyətin keyfiyyət kompleksidir. Pedaqoji ustalığın yaradıcı faktoru – uşağın şəxsiyyətinə humanist təsir, yüksək mənəvi dəyərlərin sözdə və işdə təsdiqi, əxlaq və qarşılıqlı əlaqələrin mənəvi normalarıdır. Bu, pedaqoqun peşə ideologiyasının pedaqoji fəaliyyətə, onun məqsədi, məzmunu və vasitələrinə münasibətidir.

Pedaqoji ustalıq bir neçə mərhələdə formalaşır:

- özünüdərk (özünümüşahidə, özünütəhlil, özünüqiymətləndirmə) mərhələsi;
- öz üzərində işin planlaşdırılması (öz üzərində iş üzrə şəxsi plan, həyat devizi, özünütərbiyə proqramı) mərhələsi;
- proqramların həyata keçirilməsi (özünəinam, özünətəsir, özünüidarə, özünütərif, özünütəltif, özünümühakimə) mərhələsi;
- nəzarət (özünənəzarət, özünəhesabat, özünüqiymətləndirmə) mərhələsi.

Başqalarını tərbiyə etmək və öyrətməyə mənəvi hüquq əldə etmək üçün pedaqoq ömrü boyu öyrənməli və özünü tərbiyə etməlidir. Ondan öz işini müasir elmi səviyyədə bilmək, dərin və hərtərəfli bilik, bacarıq tələb olunur.

Müasir dövrdə elmi-texniki və informasiya axını şəraitində yüksək erudisiyaya malik olmaq da çox mühümdür. Uşaqlar və valideynlər müəllimə, tərbiyəçiyə onları daima axtarışa, özünütəhsilə cəlb edən suallar verirlər. Pedaqoq bu müraciətlərə o zaman cavab verə və kömək edə bilər ki, öz üzərində daim, fasiləsiz işləsin.

Pedaqoji ustalığa yiyələnməyin bir neçə mərhələsini ayırmaq olar:

- İlkin (elementar) mərhələ - pedaqoq yalnız peşə fəaliyyətinin ayrı-ayrı keyfiyyətlərinə malikdir; bu, hər şeydən əvvəl, pedaqoji fəaliyyət üzrə fənnin tədrisi metodikası üzrə biliklərə malik olmaqdır. Uşağın şəxsiyyətinə təsir etmək, onunla dialoq aparmaq texnikası barədə təcrübəsi yoxdur; onun təlim-tərbiyə fəaliyyətinin məhsuldarlığı aşağıdır.

- baza mərhələsi - müəllim pedaqoji ustalığın əsaslarını bilir; pedaqoji fəaliyyəti humanistyönümdədir, uşaqlarla və həmkarları ilə münasibəti müsbət əsasda inkişaf edir, tədris etdiyi fənni yaxşı mənimsəyib, təhsil prosesini metodik əminliklə və sərbəst təşkil edir. Bu səviyyəyə, bir qayda olaraq, ali məktəbi yaxşı qurtaran tələbələr nail olurlar.

- yetkin mərhələ - pedaqoqun fəaliyyəti onun yüksək keyfiyyəti, qarşılıqlı dialoji ünsiyyəti ilə xarakterizə olunur. O, öz fəaliyyətini sərbəst planlaşdırır və təşkil edir; bunun üçün baş vəzifə uşağın şəxsiyyətinin inkişafını təmin etməkdən ibarətdir.

- novator mərhələ - təşəbbüskarlıq, peşə fəaliyyətinə yaradıcı yanaşma ilə xarakterizə olunur. Pedaqoq sərbəst surətdə məqsədəmüvafiq orijinal pedaqoji priyomlar yaradır, fəaliyyətini reflektiv təhlilə əsaslandırmaqla qurur; novator pedaqoq mütərəqqi adamdır, yeni həyati tendensiyaları hiss edir, zamanın nəbzini tutur, gələcəyə yönələn müasir prioritetlərdən yaxşı baş çıxarır. O, formalist deyil, öz işinə sənət kimi yanaşır ki, bu da onun həyatını məzmunlu edir, ona həzz və sevinc verir, gələcək kəşflərə ruhlandırır.

Yaradıcı pedaqoqun pedaqoji mövqeyi budur ki, o, tərbiyə etdiyi uşaqlarla qarşılıqlı münasibəti əməkdaşlıq, birgə yaradıcılıq, qarşılıqlı hörmət, inam, xeyirxahlıq prinsipləri üzərində qurur.

Müəllim peşəsini seçən insan, birinci növbədə, yaradıcıdır, ünsiyyətcildir, kommunikativdir, səriştəlidir. Sadəcə olaraq, başqa cür olmaq mümkün deyil, axı o, ən azı, zərif material olan uşaq qəlbi və ağlı ilə işləyir. Buna görə müəllimin yaradıcı olmamağa haqqı yoxdur. Müəllim olmaq, deməli, irəliyə getmək, pedaqoji özünütəkmilləşdirmənin zirvəsinə can atmaq deməkdir. O, bilir ki, buna nail olmaq çətindir. Onu da bilir ki, bir yerdə durmaq mümkün deyil.

Pedaqoqun əməyinin məzmunu və təşkilini düzgün qiymətləndirmək üçün onun öz fəaliyyətinə yaradıcı münasibətini təyin etmək, qarşıya qoyduğu məqsədə nail olmaq üçün imkanlarından istifadə etmək dərəcəsini müəyyən etmək lazımdır. Buna görə də pedaqoji fəaliyyətin yaradıcı xarakteri onun obyektiv xarakteristikası hesab olunur.

Milli təhsil sistemi müəllimə pedaqoji özünüreallaşdırmaq üçün böyük imkanlar verir. Yaradıcı müəllimlər öz fəaliyyətinin prinsiplərini belə ifadə edirlər: “ Mən çalışıram ki, bilikləri “dadlı edim”. Bu pedaqoji fəaliyyətə kompleks yanaşma hesab oluna bilər və onun əsas prinsipləri aşağıdakılardır:

- motivasiya cazibədarlığı (uşaqlar üçün qavramanın cəlbedici optimal vasitələrini yaratmaq).

- innovativ yanaşma (məzmun və formaca müxtəlif layihələr yaratmaq).

- hər kəsə qabiliyyətinə, meyilinə görə fərdi yanaşmadan istifadə etmək.
- reseptli pedaqogikadan uzaqlaşmaq, yaradıcı fəaliyyətə keçmək.

Beləliklə, öz peşəsinin tələblərinə cavab vermək və təlim-tərbiyə prosesinin keyfiyyətinə zəmanət vermək üçün pedaqoq peşəkar olmağa, öz peşəsinin ustası olmağa çalışmalı, pedaqoji ustalığın zirvəsini fəth etməyə nail olmalıdır.

*Rəyçi: prof. M.Həsənov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Митина Л. Психология профессионального развития, М., 1998.

2. Иванов Д. Компетентности и комплексный подход в современной образовании, М., Чистые пруды, 2007.

3. Абас И. Профессиональное развитие педагогов в условиях дополнительного образования., М., 2003.

4. Сухомлински В. Ürəyimi uşaqlara verirəm, Bakı: Maarif, 1978.